"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"

ADPU 100

## Professor Cəfər Cəfərov: "...igid oğullarımız öz qanları bahasına Xocalı soyqırımının öcünü aldılar!"

**Hörmətli həmkarlar! Əziz tələbələr!** Bu gün xalqımızın və dövlətimizin tarixində olduqca ağır hadisələrdən biri, əsrin faciəsi adlandırılan Xocalı soyqırımının törədilməsindən 29 il ötür. Azərbaycan xalqının azadlıq yaddaşına qanla yazılan və silinməz izlər qoyan bu misilsiz faciə insanlıq adına yaxılmış qara ləkə kimi əsrlər keçsə də, tarixdən silinməyəcəkdir. XX əsrin sonlarında keçmiş sovetlər məkanında baş verən çalxalanmaları fürsət bilən ermənilər yenidən öz məkrli planlarının icrasına başlayaraq Dağlıq Qarabağ Muxtar Vilayətində (DQMV) ərazi iddiaları ilə çıxış edərək Azərbaycan xalqı və dövlətinə qarşı təxribatçı hərəkətlərə başladılar. Getdikcə daha da şiddətlənən iddialar fonunda Azərbaycan xalqına qarşı alovlandırılan bu haqsız münaqişənin nəticəsində Azərbaycan ərazilərinin 20 %-i işğal olundu, 1 milyona yaxın soydaşımız öz dədə-baba yurdlarından didərgin düşdü. Erməni xislətinin ən dəhşətli təzahürlərindən biri də heç şübhəsiz Xocalıda yaşandı. 1992-ci ilin fevral ayının 25-dən 26-na keçən gecə keçmiş SSRİ-nin 366-cı motoatıcı alayının dəstəyi ilə torpaqlarımıza göz dikmiş mənfur erməni qəsbkarları müdafiəsiz qalan Xocalıya üç tərəfdən hücuma keçərək şəhəri ağır artilleriyadan gülləbarana tutdular. Nəticədə xalqımızın mərd övladları tərəfindən son nəfəslərinədək müdafiə olunsa da, o gecə Xocalıda əsl soyqırımı yaşandı. 613 günahsız sakin vəhşicəsinə qətlə yetirildi. Onlardan 106-sı qadın, 70-i qoca, 63-ü uşaq idi. 8 ailə tamamilə məhv edilib, 25 uşaq hər iki valideynini, 130 uşaq isə valideynlərindən birini itirib. 487 nəfər yaralanıb, 1275 nəfər girov götürülüb, 150 nəfərinsə taleyi hələ də məlum deyil. Lakin bütün bu ağrı-acılara baxmayaraq, xalqın ağır günündə müdrik Azərbaycan xalqı ümummilli lider Heydər Əliyevi siyasi hakimiyyətə gətirdi. Nəticədə 1993-cü ildən etibarən yenidən ayağa qalxan, öz şanlı dövlətçilik əsaslarını yenidən möhkəmləndirən Azərbaycan böyük inkişaf yolu keçdi. Ötən 30 ilə yaxın müddətdə Azərbaycan dövləti ulu öndər Heydər Əliyev və möhtərəm cənab Prezident İlham Əliyevin rəhbərliyi ilə ictimai-sosial, siyasi-iqtisadi həyatın bütün sferalarında əzmlə irəliləməklə yanaşı, Azərbaycan həqiqətlərinin dünyaya çatdırılması da xarici siyasətimizin dönməz xətlərindən biri oldu. Bunun nəticəsidir ki, 2008-ci ildən etibarən Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın rəhbərliyi ilə müntəzəm aparılan "Xocalıya Ədalət!" beynəlxalq kampaniyası çərçivəsində dünyanın bir çox ölkələrində Xocalı soyqırımının təbliği istiqamətində xeyli əməli addımlar atıldı. Nəhayət, cənab Prezident, müzəffər Ali Baş Komandanın uzunmüddətli siyasətinin məntiqi və strateji yekunu kimi, 2020-ci ilin sentyabr ayının 27-də düşmənin növbəti təxribatlarına cavab olaraq başlanan əks-həmlə əməliyyatı ilə bünövrəsi qoyulan Vətən müharibəsində qüdrətli Azərbaycan ordusu, yenilməz Azərbaycan xalqı və uzaqgörən Azərbaycan diplomatiyası parlaq zəfər çaldı, tarixi ədalət bərpa olundu. 44 günlük Vətən müharibəsinin yekununda Azərbaycanın ərazi bütövlüyü bərpa olundu, igid oğullarımız öz qanları bahasına Xocalı soyqırımı və ermənilər tərəfindən xalqımızın başına gətirilən digər müsibətlərin öcünü aldılar! **Əziz müəllim və tələbələr!** Bu tarixi zəfər eyni anda onu da göstərdi ki, bu müddətdə Azərbaycan müəllimi öz öhdəsinə düşən vəzifələri şərəflə icra edib. Bu gün bizlərin, müəllim və tələbələrin də əsas öhdəliyi şəhidlərimizin qanı-canı bahasına bərpa olunan ərazi bütövlüyümüzü, Azərbaycan dövləti və xalqının maraqlarını göz bəbəyi kimi qorumaq, yetişən balalarımızı daha da vətənpərvər ruhda və sağlam əqidədə tərbiyə etməkdir.



**Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, professor Cəfər Cəfərov**




### ADPU ilə Rusiya İnformasiya və Mədəniyyət Mərkəzi arasında əməkdaşlıq məsələləri müzakirə edilib



Səh.2

### Xocanın dönüşü



Səh.3

### Professor Mahira Hüseynova Şəhid Xudayar Yusifzadənin büstünün açılışında iştirak edib



Səh.4

### ADPU-nun məşhur məzunları

Səh.5



Əfəd Məhəmməd oğlu Qurbanov



Mirvarid Paşa qızı Dilbazi



Məmməd Araz



Şıxəli Qurban oğlu Qurbanov



İsa Əkbər oğlu Həbibbəyli

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur.

63

Fevral, 2021 / № 02 (1105)

## Rektor təhsildən danışdı




Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru professor Cəfər Cəfərov İslahatçı Gənclər İctimai Birliyinin Azərbaycan Gənclər Fondu tərəfindən maliyyələşdirilən "FİKİR" İnformasiya Platforması layihəsi çərçivəsində "Editor.az İnformasiya Portalı"nın Editortv youtube kanalında yayımlanan proqramda qonaq olub. Gənc jurnalist Gülnarə Abbasova isə təhsilimizin cari reallıqları və perspektiv strateji hədəfləri barədə həmsöhbət olan professor Cəfər Cəfərov ADPU misalında distant təhsilin tətbiqinin bugünkü vəziyyəti və inkişaf istiqamətləri, universitetlərdə təhsil haqlarının optimallığı, tələbə-müəllim və tələbə-universitet münasibətləri, tələbələrin müraciət imkanları, beynəlxalq əməkdaşlıq, xarici tələbələrin cəlbi, ikili diplom və tələbə və müəllimlər üçün mübadilə proqramları, hazırkı informasiya əsrində müəllimin yeri və rolu, yeni tələblərə uyğun kadr hazırlığı, əməkdaşların səriştələrinin sertifikasiyası, tətqiqatçılıq mühiti və s. məsələlər haqda önəmli mətləblərdən söz açıb, bu sahədə aparılan tədqiqatlardan danışıb. **Müsahibə ilə aşağıdakı QR kodu telefonunuzda oxudaraq tanış ola bilərsiniz.**

*Qeyd: Əziz oxucu!*
*Əgər sizin telefonunuzda QR oxuma funksiyası yoxdursa, zəhmət olmasa , öncə **"Play Market" dən QR kod oxuyucu proqram** yükləyib, sonra həmin proqramda aşağıdakı kodu oxudun.*

## ADPU ilə Rusiya İnformasiya və Mədəniyyət Mərkəzi arasında əməkdaşlıq məsələləri müzakirə edilib

Fevralın 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Rusiya İnformasiya və Mədəniyyət Mərkəzinin (RİMM) yeni rəhbəri İrek Zinnurov ilə görüş keçirilib. Görüşdə universitetin rektoru, professor Cəfər Cəfərov ADPU ilə Rusiyanın təhsil müəssisələri və RİMM arasında geniş əlaqələrdən danışıb, ali təhsil ocağı haqqında məlumat verib. Rektor vurğulayıb ki, Azərbaycanda müəllim hazırlayan ən böyük ali təhsil müəssisəsi olaraq ADPU-nun tərkibində 5 filial, kollec və baza məktəbi mövcuddur. Universitetdə 8 fakültə üzrə müəllim hazırlığı aparılır. Fakültələrin hər birində rus bölməsi fəaliyyət göstərir. Hazırda ADPU-da rus bölmələri üzrə 600-dən çox tələbə təhsil alır. İrek Zinnurov RİMM-in fəaliyyəti və yeni strategiyası haqqında geniş məlumat verib. O, gələcək əməkdaşlığın vacib olduğunu deyib. Görüşdə ölkələrimiz arasında bütün istiqamətlərdə əməkdaşlığın olduğunu qeyd edən tərəflər təhsil sahəsində gələcək işlər haqqında fikir mübadiləsi aparıblar. Bu görüşün iki qurum arasında əlaqələrin inkişafında müstəsna rol oynayacağını bildiriblər.





## ADPU-da Gənclər Günü ilə bağlı onlayn görüş olub

Fevralın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi "2 Fevral - Azərbaycan Gəncləri Günü" münasibətilə 2020-ci il ərzində universitetin ictimai fəaliyyətdə və tədrisdə fərqlənən tələbələri, o cümlədən tələbə təşkilatlarının rəhbərləri ilə onlayn görüş keçirib. "Microsoft Teams" platformasında keçirilən görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli iştirak edib. Görüşdə çıxış edən prof. C.Cəfərov iştirakçıları Gənclər Günü münasibətilə təbrik edərək pandemiya dövründə ADPU tələbələrinin həm distant tədrisdə, həm ictimai-sosial sferada xüsusi fərqləndiyini qeyd edib. Çıxış edənlərdən prof. F.Rzayev və dos. E.Aslanov son bir ildə ictimai və tədris sahəsində görülən işlərdən və əldə olunan müsbət nəticələrdən danışıb, bunun bariz nümunəsi kimi, ADPU-nun Tələbə Gənclər Təşkilatının (TGT) yaxın günlərdə "İlin TGT-si" seçilməsini, son iki imtahan sessiyasında da tələbələrin yüksək ÜOMG göstəriciləri ilə seçildiklərini ifadə ediblər. Tələbələr gənclər günü ilə bağlı öz təəssüratlarını bölüşüblər. Sonra universitet rəhbərliyi tərəfindən son bir ildə tədrisdə xüsusilə fərqlənən 10 nəfər və ictimai fəaliyyətdə xüsusilə fərqlənən 15 nəfər tələbə Fəxri Fərmanla təltif olunub. Qeyd edək ki, Gənclər Günü ilə bağlı tələbələrlə silsilə onlayn görüşlər və tələbələrin təltif olunması o cümlədən ADPU-nun filiallarında da keçirilib.



## ADPU-da Umud Rəhimoğlu ilə görüş

Fevralın 5-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Beynəlxalq Mətbuat İnstitutunun Azərbaycan Milli Komitəsinin rəhbəri, Azərbaycan Mətbuat Şurasının sədr müavini, Azərbaycan Yazıçılar Birliyinin üzvü, Milli Qeyri-Hökumət Təşkilatları Forumu idarə heyətinin üzvü, Beynəlxalq Avrasiya Mətbuat Fondunun (BAMF) qurucusu və sədri Umud Rəhimoğlu ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, Elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, Ümumi işlər üzrə prorektor Tural Cəlilov və ADPU nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin (ADPK) direktoru dosent İsrayil İsgəndərov iştirak edib. Görüş zamanı çıxış edən rektor C.Cəfərov U.Rəhimoğlunun fəaliyyəti haqqında geniş məlumat verib və onun ADPU-nun ictimaiyyətlə əlaqələrinin təkmilləşdirilməsində verdiyi dəstəyi görüş iştirakçılarına çatdırmışdır. Rektor Umud Rəhimoğlunun vətəndaş cəmiyyətinin ən tanınmış nümayəndələrindən olduğunu və ölkəmizin mətbuat sahəsində xüsusi işlər apardığını qeyd edib və U.Rəhimoğlunu 60 illik yubileyi münasibətilə təbrik edərək ona xoş arzularını çatdırıb.

Rektor C.Cəfərov daha sonra son illərdə ADPU-da görülən işlər haqqında qısa məlumat vermiş və hədəfdə daha geniş şaxəli planların olması haqqında danışaraq qeyd edib ki, ADPU böyük ənənəyə sahib və mənəvi dəyərlər üzərində qurulmuş bir ali təhsil ocağıdır. 30 illik həsrətimiz olan doğma Qarabağın işğaldan azad olunmasının ölkəmizin tarixinin ən gözəl səhifəsi olduğunu bildirən rektor gələcək arzular içində ADPU-nun köçkün düşmüş Ağcabədi filialının da öz yurduna, Şuşa şəhərinə qayıtmasının xüsusi yer tutduğunu bildirib. Görüş zamanı Umud Rəhimoğlunun da Füzuli rayonunda doğulduğunu və illərdir öz ata-baba yurdundan uzaq qaldığını bildirən rektor qonağı Füzuli rayonunun işğaldan azad olunması münasibətilə də xüsusi təbrik edib. Görüş iştirakçıları da prof. C.Cəfərovun təbriklərinə qoşularaq Umud Rəhimoğluna gələcək fəaliyyətində uğurlar arzulayıblar. Umud Rəhimoğlu ADPU-nun rəhbərliyi tərəfindən 60 illik yubileyi münasibətilə və ADPU-nun ictimaiyyətlə əlaqələrinə verdiyi xüsusi dəstəyə görə "Fəxri Fərman" ilə təltif olunub. Görüşün sonunda Umud Rəhimoğlu ADPU rəhbərliyinə diqqətə görə minnətdarlığını bildirib.





## Xocanın dönüşü

Təxminən 30 il əvvəl... O zamanlar zalımın hökm etdiyi, xeyirlə-şərin yerini dəyişdiyi, Azərbaycan xalqının başının üstünü qara buludların aldığı bir zaman idi. Köməksiz, əliyalın xalq, xaotik idarə olunan ölkə taleyin ümüdünə qalmışdı. Belə bir vaxtda boşluqdan istifadə edib Vətənin dilbər guşəsi - Qarabağın bağrında çiban kimi baş qaldıran erməni qəsbkarları vəhşi bir ehtirasla qonşu torpaqlarına hücuma keçdi. Bu günün sabahı var deməyib, ədaləti gücdə görən qorxaq və miskin varlıqlar doğma yurdumuza soxuldular və yurdun insanının köməksiz və çaşqın halında ona amansız divan tutdular. Bu müsibətlərin nəticəsində Qarabağ kimi əvəzsiz və ayrılmaz parçamız bizdən zorla qoparıldı, işğal altına düşdü, 1 milyondan çox soydaşımız doğma yurd-yuvasından didərgin düşdü, 20 min nəfərdən çox bacı və qardaşlarımız Şəhid oldu, minlərlə yurddaşımız öz yurdunda yağının olmazın işgəncələrinə məruz qalıb, girov oldular... - bu mənzərəni bir neçə sətirlik yazı ilə təsvir etmək belə olduqca dəhşətlidir. Bəs başər tarixində misli görülməmiş bu cür vəhşilik və qəsbin səbəbi nə idi?! Yuxarıdakı suala cavab verməmiş bu tələtümlü hadisələrin daima qan sızan yarası, bəşəriyyətin qara ləkələrindən biri olan "Xocalı soyqırımı"na nəzər salaq. Təsəvvür elə: bir gecədə bir şəhəri Yer üzündən silmək, onun əhalisini güllə-baran etmək, sağ qalanlara amansızlıqla və ən ağlagəlməz üsullarla işgəncələr etmək, mindən çox insanı girov aparmaq, minlərlə insanı qarlı-şaxtalı yollarla meşələrə, dağlara sıxışdırmaq ... - özü də Azərbaycanın döyünən ürəyində, toy-büsatlı musiqi paytaxtında - Qarabağda. Buna necə cürət edə bilmişdi bədnam erməni qonşularımız?! ...

Bu yazını oxuyan əziz Gənc! "Xocalı" adı məna-mənşə etibarilə saf türkcədən gəlir və "xoca" - "müəllim, ağsaqqal" sözündən olub "böyüklü, ağsaqqallı yer" demək. Mistik olsa da, bunu xatırlamamızda hikmətli və ibrətamiz bir uyğunluq var. Bir məkan ki, adında "ağsaqqal, böyük, yolgöstərən, müəllim" sözü ola, o yeri nə zaman zəbt etmək olar?! - Bu məkan "xocasız" qalanda... Bəli, məhz xocasız - rəhbərsiz, böyüksüz, başsız qalanda! Vaxtilə ölkəmizin ağır günlərində xocasızlıq ucbatından Xocalı boyda bir tonqal qalandı Azərbaycanın bağrında - xalqımız tarixin şahid olmadığı soyqırımına uğradı... Bu acı dünya durduqca bizimlə yaşayacaq. Lakin, qeyrətli Azərbaycan xalqı özünü topladı, - bu qandonduran vəhşətə baxıb sınmadı, əksinə and içdi ki, bir gün xocaları ilə birgə bu torpaqlara geri dönəcək və döndü də! Nəhayət 28 il sonra müzəffər Ali Baş Komandan, Cənab prezident İlham Əliyevin rəhbərliyi – xocalığı ilə qüdrətli Azərbaycan Ordusu 44 günlük "Vətən müharibəsi" ilə şanlı zəfərə imza atdı – ərazi bütövlüyümüzü bərpa etdi! Bu gün Xocanın dönüş günüdür! Yaralı Xocalı, bağışla bizi! Biz bütün yaralarını sarımağa gəldik. Səni qanla tərk etmişdik, qanla da geri dönürük, Ana Vətən uğrunda üç minə yaxın oğul özünü qurban dedi! Amma bu dəfə əbədi və xocalı gəlmişik! Sənin bizə, bizim sənə dönüşümüz mübarək!

**Taleh MİRZƏYEV,**
**ADPU**



## ADPU tələbələri Zəfərimizin 100-cü gününə həsr edilən ağacəkmə aksiyasında iştirak ediblər

Fevralın 16-da "Davam" Gənclər Hərəkatı (GH) və Bakı Şəhər Gənclər və İdman Baş İdarəsinin (BŞGİBİ) birgə təşkilatçılığı, eləcə də Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyi (AR GİN), Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyi (AR ETSN), Azərbaycan Respublikasının Gənclər Fondu (AR GF) və Səbail Rayon İcra Hakimiyyətinin (RİH) dəstəyi ilə ağacəkmə aksiyası həyata keçirilib. Aksiya böyük Zəfərimizin 100-cü gününə və Vətən uğrunda canını qurban verən şəhidlərimizin əziz xatirəsinə həsr olunub. Aksiyaya AR GİN müavini Fərhad Hacıyev, Səbail RİH başçısı Vüqar Zeynalov, "Davam" GH-nin sədri Nihad Allahyarlı, BŞGİBİ-nin rəisi Raqif Abbasov, həmçinin şəhid ailələrinin üzvləri, qazilər, müharibə iştirakçıları, olimpiya və dünya çempionları və tələbələr qatılıb. O cümlədən aksiyada Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 40-a yaxın könüllü tələbəsi də iştirak edib. Tədbir şəhidlərimizin bir dəqiqəlik sükutla anılması ilə başlayıb, daha sonra canlı şəkildə Azərbaycan dövlət himni ifa edilib. Bununla yanaşı gənclər tərəfindən eni 10 metr, uzunluğu 20 metr olan şanlı Azərbaycan bayrağı ilə fləşmob keçirilib. Fləşmobun ardından start götürən aksiya zamanı 150-dən çox fəal gəncin iştirakı ilə 200-dən çox ağac tingləri əkilib, suvarılıb və xüsusi qaydada qulluq göstərilib.



## ERASMUS+ "İQAinMR" layihəsinin I onlayn koordinasiya görüşü keçirilib



16 fevral 2021-ci ildə ADPU-da Avropa Kommissiyasının ERASMUS+ "İQAinMR" layihəsinin birinci onlayn görüşü keçirilib. Niderlandın Vittenborq Tətbiqi Elmlər Universitetinin koordinatoru olduğu layihənin ilk görüşündə beynəlxalq tərəfdaş qismində Almaniyanın İUBH Tətbiqi Elmlər Universiteti, İspaniyanın UCAM Universiteti, Rusiyanın Təhsil Akademiyası, Tver Dövlət Universiteti, Belqrad Dövlət Universiteti, Maliyyə Universiteti və yerli tərəfdaş qismində Naxçıvan Dövlət Universiteti, Milli Erasmus Ofisinin nümayəndələri iştirak ediblər. İki hissədən ibarət olan görüşün birinci hissəsində hər bir tərəfdaş universitetin təqdimatı keçirilib. İkinci hissədə 3 illik layihənin qarşısında duran vəzifələr, işçi paketləri üzrə tapşırıqlar, ilkin mərhələdə nəzərdə tutulan işlər müzakirə olunub. Layihənin məqsədi Azərbaycan ali məktəblərin daxili keyfiyyət təminatının beynəlxalq keyfiyyət standartlarına uyğun olaraq artırılması və inkişafa yönəldilməsidir. Bu layihə ali təhsilin iki əsas sahəsinə istiqamətlənib: tədrisin keyfiyyət təminatı (tədris, öyrənmə və qiymətləndirmə) və müəllim keyfiyyətinin təminatı. Layihə, bir universitet səviyyəsində tədris/öyrənmə keyfiyyətini artırmağı, öyrənmə keyfiyyətini inkişaf etdirməyi hədəfləyir. Görüşdə ADPU-nun əməkdaşları Günay Məhərrəmova, Həmid Qasımov və Nurəngiz Mahmudova iştirak ediblər. Görüşün sonunda tərəfdaşların sualları cavablandırılıb.

## ADPU-nun 100 illiyi ilə bağlı tədbirlər planının icrası müzakirə olunub

Fevralın 17-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illik yubileyi ilə əlaqədar tədbirlər planının icra vəziyyəti ilə bağlı rektor, professor Cəfər Cəfərovun rəhbərliyi ilə universitet rəhbərliyinin iclası keçirilib. İclasda Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov, Rektor müşaviri Ümid Mehdiyev, Tədris departmentinin müdiri, dosent Sənan Əliyev və Sosial və humanitar məsələlər üzrə prorektorluğun əməkdaşı Cavid Hüseynov iştirak edib. Toplantıda tədbirlər planı təsdiq olunandan keçən dövr ərzində görülən işlər və planın icra vəziyyətinin qarşıya qoyulan hədəflərə uyğunluğu dəyərləndirilib. 100 illiklə bağlı görüləcək işlərin icrası üçün yaradılan işçi qrupların tərkibi bir də müzakirə edilib, lazımi düzəlişlər və əlavələrlə bağlı göstərişlər verilib. İclasın sonunda növbəti dövrə iclasına qədərki hesabat müddəti üçün müvafiq hədəflər təsdiq edilib.

## ADPU-da tələbələr üçün "Microsoft Office tətbiqi proqramları" üzrə təlim kursuna start verilib

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) könüllü tələbə Turanə Paşayevanın təşəbbüsü və Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin təşkilatçılığı ilə tələbələrin onlayn dərslərinə dəstək və İnformasiya və Kommunikasiya Texnologiyalarından (İKT) istifadə imkanlarının artırılması məqsədi ilə "Microsoft Office tətbiqi proqram paketi"nə daxil olan MS Word, MS Excel və MS PowerPoint proqramlarında praktiki və səmərəli işləmə üzrə təmənnasız könüllü təlim kursuna start verilib. Təxminən 1 ay yarım, 2 ay davam edəcək təlimlərə universitet tələbələri böyük maraq göstərib və 300 nəfərə yaxın tələbə müraciət edib. Fevralın 22-də ilk sessiyası reallaşan təlim MS Teams platformasında paralel qruplar üzrə həftədə 3 dəfə, 1,5 saat olmaqla praktik şəkildə keçirilir. Təlimlər layihənin təşəbbüsçüsü, İnformatika müəllimliyi ixtisasının I tədris ili tələbəsi, könüllü təlimçi Turanə Paşayeva, ADPU-nun İKT Mərkəzinin bölmə müdiri, mütəxəssis Rüfət Əliyev və Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli tərəfindən paralel şəkildə aparılır. Tələbata görə növbəti aylarda da layihənin yeni qruplarla davam etdirilməsi planlaşdırılır.



## Əbdürrəhim bəy Haqverdiyevin 150 illik yubileyinə həsr olunmuş respublika elmi- praktik konfransı

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) təşkilatçılığı ilə 28 yanvar 2021-ci il tarixdə onlayn formatda "Maarifçi-demokratik və realist ədəbiyyatın görkəmli nümayəndəsi Əbdürrəhim bəy Haqverdiyev" Respublika elmi-praktik konfransı keçirilmişdir. ADPU- nun rektoru, professor Cəfər Cəfərov belə bir konfransın keçirilməsinin əhəmiyyətini vurğulamış, təşkilatçılara təşəkkür edərək bildirmişdir ki, Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, böyük dramaturq, nasir, publisist, teatr təşkilatçısı, tanınmış ictimai xadim Əbdürrəhim bəy Haqverdiyevin anadan olmasının 150 illiyinə həsr olunmuş bu elmi tədbirin keçirilməsi bizim mənəvi borcumuz və böyük sənətkara dərin ehtiramımızdır. Rektor Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamını yüksək qiymətləndirmiş, Ə.Haqverdiyevin adının UNESKO-nun 2020-2021-ci illər üçün görkəmli şəxslərin və əlamətdar hadisələrin yubileyləri siyahısına daxil edilməsini mühüm hadisə kimi qeyd etmişdir. Konfransda Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova "Ə.Haqverdiyevin əsərlərində dialektizmlər və onların ümümtürk dilinə qarşılıqlı inteqrasiyası", AMEA-nın Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun Yeni dövr Azərbaycan ədəbiyyatı şöbəsinin müdiri, professor İslam Qəribli "Ə.Haqverdiyevin irsinin öyrənilməsinə yeni baxış", Ədəbiyyat kafedrasının müdiri, dosent Razim Məmmədov "Əbdürrəhim bəy Haqverdiyev Tiflis ictimai- ədəbi mühitində", filologiya üzrə fəlsəfə doktoru Yeganə Qasımova isə "Ə.Haqverdiyevin bədii nəsrində folklor motivləri" mövzusunda məruzə ilə çıxış etmişlər. ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, rofessor Asəf Zamanov konfransda təqdim edilən məruzələrin ADPU-nun dövri-elmi jurnallarında dərc olunacağını diqqətə çatdırmış və konfrans iştirakçılarına universitet rəhbərliyi adından təşəkkür etmişdir.




## Professor Mahirə Hüseynova Şəhid Xudayar Yusifzadənin büstünün açılışında iştirak edib

Fevralın 18-də Vətən müharibəsinin əfsanəvi qəhrəmanlarından, yaddaşlarda güllər üzü və ifa elədiyi məşhur "Vətən yaxşıdır" mahnısı ilə qalan, "Azərbaycan Bayrağı" ordenli Şəhid Xudayar Yusifzadənin vaxtilə təhsil aldığı Bərdə şəhər 1 nömrəli Uşaq İncəsənət Məktəbində büstünün açılışı olub. Açılış mərasimində Şəhidin ailə üzvləri, Bərdə Regional Mədəniyyət İdarəsinin rəhbərliyi, məktəbin pedaqoji və şagird heyəti ilə yanaşı Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova və fakültənin professor-müəllim heyəti də iştirak edib. Professor Mahirə Hüseynova şəhid Xudayar Yusifzadənin büstü önünə əklil qoyaraq çıxış edib, işğal altında olan torpaqlarımızın azad olunmasında misilsiz qəhrəmanlıq göstərən Azərbaycanın Xudayar və Xudayar kimi vətənpərvər oğullarının Vətən, dövlət və xalq qarşısında öz borclarını ödəyib qəhrəmanlıq nümunəsi yaratdıqlarını, milyonlarla insanın sevgisini, rəğbətini qazandığını, bizlərə doğma Qarabağımızı geri qazandırdıqlarını bildirib. Professor şəhidin anası Radə Qurbanova ilə görüşərək Xudayar Yusifzadənin hər bir azərbaycanlının fəxri olduğunu bildirib. Şəhid anası Vətən uğrunda şəhid olmuş oğlunun xatirəsinə göstərilən diqqət və qayğıya görə Prezident İlham Əliyevə və Birinci vitse-prezident Mehriban xanım Əliyevaya, Azərbaycan xalqına minnətdarlığını bildirib. Xatırladaq ki, professor Mahirə Nağıqızı şəhid Xudayar Yusifzadəyə "Özün millət üçün dastana döndün" adlı şeir həsr edib. "Gənc Müəllim"in ötən sayında təqdim etdiyimiz şeirdən müəyyən hissələri xanəndə Elnur Zeynalov "Xudayar təsnifi" üzərində səsləndirib.




## Fizika fakültəsində pedaqoji təcrübənin təşkilinə dair onlayn konfrans




Fevralın 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika fakültəsində "Microsoft Teams" platforması üzərindən pedaqoji təcrübənin təşkilinə həsr olunan onlayn konfrans keçirilib. Konfransda fakültənin dekanı, dosent Arzu Daşdəmirov xüsusi karantin rejimində pedaqoji təcrübənin məsafədən təşkili ilə bağlı bəzi məsələləri diqqətə çatdırıb. O qeyd edib ki, 2020/2021-ci tədris ilində ADPU-nun bakalavriat və magistratura səviyyələrində pedaqoji, elmi-pedaqoji, elmi-tədqiqat, istehsalat, çöl təcrübəsinin təşkilinə dair bir sıra təkliflər Təhsil Nazirliyinə təqdim olunub. Pedaqoji təcrübə müddətində təcrübəçi tələbələrin sınaq dərslərinin sayının azaldılaraq 6 dərs həcmində müəyyən edilməsi, sınaq dərslərinin videoyazısının aparılması təkliflər arasında yer alıb. A.Daşdəmirov qeyd edib ki, ilk dəfə Fizika fakültəsi ilə Təhsil İnstitutu arasındakı əməkdaşlıq əsasında fakültənin IV kurs eksperimental qrup tələbələri "STEAM" üzrə təlimə cəlb olunacaq. Fizikanın tədrisi texnologiyası kafedrasının müdiri, dosent Sevinc Cəlilova pedaqoji təcrübədə 92 nəfər IV kurs tələbəsi, metodistlər, pedaqoqlar və psixoloqların iştirak edəcəyini deyib. Fizika fakültəsi üzrə pedaqoji təcrübə rəhbəri, professor Şükür Əlizadə pedaqoji təcrübənin mövcud vəziyyətə uyğun təşkili ilə bağlı müvafiq tövsiyə və təkliflərini verib, sınaq dərslərinin icmallarının yazılma qaydalarını diqqətə çatdırıb. Tədris departamentinin direktor müavini, dosent Ənvər İmanov pedaqoji təcrübənin xüsusi karantin rejiminin tələblərinə uyğun olaraq məsafədən təşkili ilə bağlı ADPU rəhbərliyinin müvafiq göstəriş və təlimatlarını diqqətə çatdırıb. Bildirib ki, mövcud vəziyyət nəzərə alınaraq pedaqoji təcrübə zamanı tələb olunan sənədlərin sayı minimuma endirilib. Pandemiya şəraitində sağlamlığı qorumaq məqsədilə xüsusi karantin rejiminin tələblərinə ciddi riayət olunmalı, pedaqoji təcrübənin distant təşkili ilə bağlı işlər vaxtında icra olunmalıdır.

## Ağaqardaşdan İlknura




Vətən müharibəsi Şəhidi, ADPU-nun Ağcabədi filialının Azərbaycan dili və ədəbiyyatı müəllimliyi ixtisasının məzunu Ağaqardaş Abbasov və onun 5 il həsrətlə gözlədiyi, Şəhid olandan sonra bu yaxınlarda dünyaya göz açan övladı İlknura...

Ağaqardaş dedi adına atan,
Sanki böyük qardaş, sanki, dayaqdın!
Göstərib, doğmaya, yadına atan,
Fəxarət keçirdi, – qızılsayaqdın!

Böyüdün, elmlə qardaşlaşdın Sən,
Müəllim eşqinə yoldaşlaşdın Sən,
Dilin əsrarına sirdaşlaşdın Sən,
Ay elmin Şəhidi, elin Şəhidi!
Dünyada ən şirin dilin Şəhidi!

Olsa da hər şeyin fövqündə elm,
Bir vaxt ki Yurdunun qövründə elin..
Onda qalxar Vətən şövqündə əlin,
Qələmli, silahlı əlin Şəhidi!
Xarıbülbül – əsir gülün Şəhidi!

Vətən çağıranda ruh cana gəldi,
Öz doğum günündə rizvana gəldi!
Beş il gözlədiyi nişanə gəldi:
Haqq naümüd qoymaz, bilin, Şəhidi!
Yadigarı daşır sirrin Şəhidin!

Cənnətə ucalıb nurdan pay verdin,
İlknurum dediyin, parlaq Ay verdin,
İlahi, çox şükür, ona hay verdin,
İllahi vüsalı görən Şəhidim!
Canın İlknuruna verən Şəhidim!

**Taleh HunObaNurlu – 25.02.2021**

# ADPU-nun məşhur məzunları

Özünün 100 illik şərəfli inkişafı dövründə Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) dünya və Azərbaycan elm və ictimai-siyasi həyatına onlarla nəhəng şəxsiyyət bəxş etmişdir. Universitetimizin adını ucaldan bu böyük şəxsiyyətlərdən növbəti beş nəfərini bu sayımızda sizə təqdim edirik.

## Afad Məhəmməd oğlu Qurbanov



Akademik Afad Məhəmməd oğlu Qurbanov 1929-cu ildə yanvarın 10-da Borçalının Qızıl Şəfəq kəndində (indi Ermənistan Respublikasının Kalinino rayonu) anadan olmuşdur. Azərbaycanın görkəmli dilçi-alimi, türkoloq, elm və təhsil təşkilatçısı, ictimai-siyasi xadimi, Azərbaycan dilçilik elmində elmi məktəb yaratmış alim, Azərbaycan Əlifba Komissiyasının sədri (1990) və hazırkı Latın qrafikalı Azərbaycan əlifbasının müəllifi, Azərbaycan SSR Natiqlik Cəmiyyətinin sədri (1980), SSRİ Pedaqoji Elmlər Akademiyasının akademiki (1989), Azərbaycan SSR Elmlər Akademiyasının üzvü (1983), Azərbaycan Yazıçılar Birliyinin üzvü, filologiya elmləri doktoru, professor (1970), Əməkdar elm xadimi (1981), Azərbaycan SSR dövlət mükafatı laureatı (1991), 1990-1994-cü illərdə isə Milli Məclisin üzvü olub. Azərbaycan Pedaqoji İnstitutunu (indiki ADPU) bitirdikdən sonra 1950-ci illərdən etibarən ADPU-da Filologiya fakültəsinin dekan müavini, dekanı, Azərbaycan dilçiliyi kafedrasının müdiri vəzifəsində çalışıb. 1981-1989-cu illərdə ADPU-nun rektoru olub. Azərbaycan dilçiliyində onomalogiya və antroponimlərin inkişafı dövrlərinin təsnifatı A.Qurbanovun adı ilə bağlıdır. Azərbaycanda və türk dünyasında "Dilçiliyin sistemi" (1976), "Dilçiliyin tarixi" (1976), "Müasir Azərbaycan ədəbi dili" (1967, 1985), "Bədii mətnin linqvistik təhlili" (1986), "Azərbaycan onomastikası" (1986), "Azərbaycan dilinin onomalogiyası" (1988), "Ümumi dilçilik", I-II cildlər (1989-1993), "Dünyanın dil ailələri" (1994) və s. kimi sanballı əsərləri ilə məşhurdur. Afad Qurbanov 26 sentyabr 2009-cu ildə vəfat edib.

## Məmməd Araz



Məmməd Araz – 1933-cü il oktyabrın 14-də Şahbuz rayonunun Nursu kəndində dünyaya göz açan Məmməd Araz ilk təhsilini həmin kənddə alıb. 1954-cü ildə Azərbaycan Pedaqoji İnstitutunu (indiki ADPU) bitirən böyük sənətkar 1961-ci ildə Moskvada Maksim Qorki adına Ədəbiyyat İnstitutunda oxuyub. Azərbaycan Dövlət Nəşriyyatında bədii ədəbiyyat redaksiyasının müdiri, sonra isə baş redaktorun müavini, "Ulduz" jurnalında məsul katib, "Ədəbiyyat və İncəsənət" qəzetində baş redaktorun müavini işləyib. 1971-1981-ci illərdə Azərbaycan Yazıçılar İttifaqının poeziya bölməsinə rəhbərlik edən Məmməd Araz 1974-cü ildən ömrünün sonunadək "Azərbaycan təbiəti" jurnalının baş redaktoru olub. Böyük sənətkar 2004-cü ilin dekabrın 1-də Bakıda vəfat edib və Fəxri xiyabanda dəfn olunub. Onun şeirinin əvvəli də, axırı da Vətəndir. Məmməd Araza məxsus "Vətən daşı olmayandan olmaz ölkə vətəndaşı" məşhur misraları müasir dövrdə poeziyada və ictimai mühitdə vətəndaşlığın milli düsturu kimi qəbul olunur. Məmməd Araz yaradıcılığının baş qəhrəmanı Azərbaycandır. Onun "Vətən mənə oğul desə", "Məndən ötdü, qardaşıma dəydi", "Mənim Naxçıvanım", "Ata ocağı", "Ana yurdum, hər daşına üz qoyum" şeirləri vətən mövzusunda ən yaxşı əsərlər kimi dillər əzbəridir. Şeir yaradıcılığında olduğu kimi, poemaları ilə də Məmməd Araz təkrarsızdır. Onun "Üç oğul anası", "Araz axır", "Mən də insan oldum", "Paslı qılınc", "Əsgər qəbri", "Atamın kitabı" poemaları hər şeydən əvvəl insan mənəviyyatının mürəkkəbliyi, tarix və müasirlik, milli tale və tarixi yaddaşın bərpası kimi fundamental məsələlərə həsr olunub. Ümummilli lider Heydər Əliyev 1995-ci ildə Xalq şairi Məmməd Arazı "İstiqlal" ordeni ilə təltif edib.

## Şıxəli Qurban oğlu Qurbanov



Şıxəli Qurban oğlu Qurbanov 16 avqust 1925-ci ildə Bakıda doğulmuşdur. Azərbaycan yazıçısı, dramaturq, şair, filoloq-alim, ədəbiyyatçı, dövlət və ictimai xadim, filologiya elmləri doktoru, Ü. Hacıbəyov adına Azərbaycan SSR Dövlət mükafatı laureatı (1967). Ş. Qurbanov 1960-cı illərdə Azərbaycan EA-nın Dil və Ədəbiyyat İnstitutuna rəhbərlik etmişdir. Dəfələrlə Azərbaycan SSR Ali Sovetinə deputat seçilmiş, "Lenin" ordeni, "İgidliyə görə" medalı, "Königsberqin alınmasına görə" medalı və "1941-1945-ci illər Böyük Vətən müharibəsində Almaniya üzərində qələbəyə görə" medalı təltif ilə olunmuşdur. Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) məzunudur. Şıxəli Qurbanov uzunmüddətli fasilədən sonra 1967-ci ildə Azərbaycanda ilk dəfə dövlət səviyyəsində Novruz bayramının keçirilməsinə müvəffəq olmuşdur. Mərkəzi Komitənin birinci katibi Vəli Axundov onu təhlükəli işlər gördüyü barədə xəbərdarlıq etmişdi. Şıxəli Qurbanov isə öz hərəkətlərinə görə özü cavab verəcəyini demişdi. Qurbanovu izahat yazmağa çağırdılar. O da Novruz bayramının tarixi ilə bağlı 22 səhifəlik izahat yazdı. Sübut etdi ki, Novruz bayramı heç də dinlə əlaqəli bayram deyil. 1967-ci ilin may ayının 24-də Şıxəli Qurbanov dişlərini müalicə etdirmək üçün həkimə gedir və elə oradaca müəmmalı şəkildə vəfat edir.

## Mirvarid Paşa qızı Dilbazi



Azərbaycanın ilk qadın Xalq Şairi Mirvarid Paşa qızı Dilbazi 19 avqust 1912-ci ildə Qazax rayonunun Xanlıqlar (indiki Musaköy) kəndində anadan olmuş, 12 iyul 2001-ci ildə Bakıda vəfat etmişdir. Şairə, tərcüməçi, 1934-cü ildən Azərbaycan Yazıçılar Birliyinin üzvü, Azərbaycan SSR xalq şairəsi (1979). "Şərəf Nişanı" (iki dəfə), "Qırmızı Əmək Bayrağı" və "İstiqlal" (1997) ordenləri ilə təltif olunub. Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) Dil və ədəbiyyat-ictimayyət fakültəsində təhsil almışdır (1929). Mirvarid xanım Nizami Gəncəvi, Xaqani Şirvani, Əlişir Nəvai, Aleksandr Puşkin, Taras Şevçenko, Samuel Marşak, Sergey Mixalkov və başqa şairlərin əsərlərini Azərbaycan dilinə tərcümə etmişdir. "Xatirələr olan yerdə", "Həyat lövhələri", "Bənövşələr üşüyəndə", "Ana qanadı", "Yasəmən fəsli", "Dağ çiçəyi" və digər kitabların müəllifi olan şairə uşaqları çox sevirdi, onlar üçün "Nağıllar", "Şeirlər", "Kiçik dostlarıma", "Gülbahar", "Bahar nəğmələri", "Lalənin ağacları", "Abşeron bağlarında" adlı kitablar yazıb. Mirvarid Dilbaziyə 1979-cu ildə Azərbaycanda ilk qadın şair olaraq Xalq Şairi fəxri adı verilmişdi.

## İsa Əkbər oğlu Həbibbəyli



Akademik İsa Əkbər oğlu Həbibbəyli – Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) vitse-prezidenti (2013), filologiya elmləri doktoru (1996), professor (1997), Azərbaycan Respublikasının əməkdar elm xadimi (1999), AMEA-nın həqiqi üzvü (2003). İsa Həbibbəyli 16 oktyabr 1949-cu ildə Naxçıvan MSSR-in Şərur rayonunda anadan olub. Azərbaycan Dövlət Pedaqoji İnstitutu Naxçıvan filialının (indiki ADPU) dil-ədəbiyyat fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir. 1975-ci ildən Naxçıvan Dövlət Universitetində (NDU) müəllim, dosent, elmi işlər üzrə prorektor, 1996-cı ildən 2013-cü ilə qədər isə NDU-nun rektoru vəzifələrində çalışmışdır. 2013-cü ilin aprel ayından AMEA-nın vitse-prezidentidir. Millət vəkilidir. 2001-ci ildə Nyu-York Elmlər Akademiyasının, 2006-cı ildə BMT yanında Beynəlxalq İnformasiyalaşdırma Akademiyasının həqiqi üzvü, 2010-cu ildə Amerika Bioqrafiya İnstitutunun akademiki seçilmişdir. Əsərləri Azərbaycan dilindən başqa ingilis, fransız, rus, türk, ərəb fars, urdu, bolqar və macar, litva və b. dillərində çap olunmuşdur. Tədqiqat sahəsi Azərbaycan ədəbiyyatı tarixi, ədəbiyyat nəzəriyyəsidir.

# İctimai həyat - tələbə təşkilatlarının fəaliyyəti

## ADPU-nun Tələbə Gənclər Təşkilatı "İlin Tələbə Gənclər Təşkilatı" seçilib

Fevralın 11-də Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) ofisində "İlin Tələbə Gənclər Təşkilatı" mükafatının təqdimetmə mərasimi keçirilib. İttifaq sədri Pərviz Mirələmli Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Gənclər Təşkilatının (ADPU TGT) sədri İsmayıl Nəsirov və idarə heyətinin üzvlərinə mükafatı təqdim edib. Təqdimat mərasiminin ardından ADPU-da rektor professor Cəfər Cəfərov və Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev təşkilatın idarə heyətini qəbul edib. Görüşdə prof. C.Cəfərov tələbələri təşkilatın bu böyük uğuru münasibəti ilə təbrik edərək bir çox cəhətdən xüsusi önəm daşıyan 2020-ci ildə ADPU tələbələri və tələbə təşkilatlarının, o cümlədən TGT-nin çox planlı və adekvat fəaliyyətindən razılığını ifadə edib. Gələcək perspektivdə də tədris keyfiyyəti və tələbə fəallığının təmininin ADPU-nun strateji hədəflərinə daxil olduğunu vurğulayıb. Qeyd edək ki, təqdimatdan əvvəl, fevralın 1-də ATGTİ onlayn formada "Dəmir yumruq, dəmir gənclik" adlı ölkə universitetlərinin TGT-lərinin mükafatlandırılması ilə bağlı konfrans keçirib. Konfransda TGT-lərin il ərzindəki fəaliyyətləri dəyərləndirilərək 2020-ci ildəki fəaliyyətinə görə ADPU TGT 4 ildən sonra yenidən, ikinci dəfə ölkə üzrə bütün rəqiblərini kifayət qədər böyük fərqlə qabaqlayaraq "İlin Tələbə Gənclər Təşkilatı" adını qazanıb. Eyni zamanda ötən ildəki ictimai-sosial fəaliyyətində xüsusi fərqlənən 28 nəfər ADPU TGT üzvü də 4 nominasiya üzrə sertifikatla mükafatlandırılıb.



## "Xocalı həqiqətləri" – ADPU THİK Xocalı soyqırımını yad edib



Fevralın 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) təşkilatçılığı ilə 26 Fevral - Xocalı soyqırımının 29-cu ildönümünə həsr olunmuş "Xocalı həqiqətləri" adlı onlayn tədbir keçirilib. Microsoft Teams platforması vasitəsi ilə baş tutan tədbirdə universitetin Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev , Bakı Dövlət Universitetin (BDU) dosenti, tarixçi-alim, "Xocalı soyqırımı: səbəbləri, həyata keçirilmə üsulları və nəticələri" kitabının müəllifi Boran Əziz, ADPU-nun Azərbaycan tarixi kafedrasının dosenti Zakir Kərimov və ADPU THİK-in sədri, ADPU-nun Azərbaycan tarixi kafedrasının dosenti Vurğun Məmmədov iştirak edib. Çıxış edənlərdən prof. F. Rzayev, dos. V. Məmmədov, tarixçilər B. Əziz və Z. Kərimov başər tarixində misli görünməmiş bu faciənin təkcə Azərbaycan xalqına deyil, bütün dünyaya qarşı törədilmiş amansız soyqırımı olmasını, mənfur erməni xislətinin bariz təzahürü olduğunu qeyd ediblər. Natiqlər bildiriblər ki, xalqımızın qan tarixində silinməz izlər və sağalmaz yara qoyan bu facia qarşısında düşmən Azərbaycan xalqının sınacağını, torpaqlarımızı birdəfəlik və daimi işğal altına alacaqlarını sanırdılar. Lakin tarixi yaddaşından güc alan xalqımız ümummilli lider Heydər Əliyevin və daha sonra cənab prezident İlham Əliyevin rəhbərliyi ilə özünü toparladı və yenidən dünyada öz haqq sözünü deməyə qabil oldu. Nəhayət, 2020-ci ilin əfsanəvi Vətən müharibəsi ilə Azərbaycanın igid oğulları öz qanları ilə şanlı Zəfərə imza atdılar, Vətənimizin ərazi bütövlüyünü bərpa etdilər. Tədbirdə fəal tələbələr çıxışlar edib, hazırladıqları videokompozisiyanı təqdim ediblər.

## ADPU YAP GB-nin üzvləri Milli Qəhrəman Mübariz İbrahimovun evində

*"Mübariz mənim deyil , elin, xalqın övladıdır!"* ADPU YAP GB fəalları Şəhid Mübariz İbrahimovun ailəsini ziyarət edərək atası Ağakərim İbrahimovla həmsöhbət olublar. Ağakərim kişi müsahibə zamanı vurğulayıb ki, sən demə Mübarizin şəhid olma xəbərini o hələ dünyaya gəlməmişdən 5 il əvvəl yuxuda alıb. Yuxusunu danışmasını xahiş edirik: *"1983-cü il idi. Rusiyada idim onda. Bir yuxu gördüm. Gördüm ki, övladlarımdan biri ölür. Yuxudan ayıldım. Dedim, ay aman, övladım ölür. Onda heç Mübariz də yox idi. 5 il sonra, 1988-ci ildə Mübariz dünyaya gəldi. Mübariz 5 il əvvəl gördüyüm yuxu idi. Yuxuda gördüyüm kimi də oldu..."*
Ağakərim kişi Mübariz haqqında bir neçə xatirəsini bölüşür: *"Mübariz məzuniyyətə gəlmişdi. Həyətdə oturmuşduq. Birdən özüm də bilmədən söhbət arasında dedim ki, 3 oğlum var, biri vətənə qurban. Mübariz qaça-qaça gəldi ki, – "Ata, nə gözəl söz dedin. Onu bir də de, səsini yazım. " Allah məni sınağa çəkirdi. Dediyim sözü qəlbdən demişəm, yoxsa dildən söz olaraqmı?!"* ***Başqa bir hadisə:*** *"Namaz üstündə idim, namazı qılıb bitirdim, dua edirdim. Anidən titrəmə gəldi. Dua etdiyim yerdə nə baş verdiyini anlamadım. Qəlbimdən bu sözləri deməyim keçdi: – "Bir oğlum vətənə qurban, heç elə bilərəm yoxdur, olmayıb ". Bu sözü ki dedim, sanki rahatladım. Bu Allahın sınağı idi. Mənim onu qəlbdən, yoxsa dildən dediyimi sınadı bir də. Az müddət sonra məlum hadisə oldu... Mübariz artıq xalqın, elin, sizin övladınızdır, oğlunuzdur. 22 yaşına kimi mənim övladım idi, amma o yaşdan sonra xalqındır. Mən isə xalqın oğlunu onlara tanıdan bir vasitəçi. Mənim üçün artıq gələcəyimiz, balalarımızın gələcəyi maraqlıdır. Şükür ki, torpaqlar alındı. Qisaslar yerdə qalmadı. Hər birinizə təşəkkür edirəm. Gəlirsiniz, baş çəkirsiniz, ziyarət edirsiniz. Minnətdaram."*

**ADPU YAP GB**

## #VİKİADPU layihəsi davam edir



Fevralın 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Təhsil Könüllüləri İctimai Birliyinin (ADPU TKİB) və Qorqud Vikipediya Metodiki Klubunun əməkdaşlığı ilə ADPU-nun 100 illiyi münasibətilə tələbələr üçün təşkil olunan könüllü vikipediya təlimləri layihəsi - "#VİKİADPU"nun açılış mərasimi keçirilib. Tədbirdə ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, ADPU-nun Tədbirlərin təşkili və tələbələrlə iş şöbəsinin müdiri Turan Kərimli, tanınmış ekspert, diaspora və Azərbaycanda vikipediya hərəkatının qurulmasında böyük xidmətləri olan Elnur Eltürk və ADPU TKİB-in sədri Taleh Mirzəyev iştirak edib. Çıxış edənlərdən prof. F.Rzayev bu təşəbbüsün hazırkı dövrdə olduqca vacib və aktual olduğunu bildirərək ADPU rəhbərliyinin daim bu tip layihələrə dəstək olduğunu bildirib. O qeyd edib ki, ADPU TKİB-in bu layihəsi vikipediya hərəkatının universitetlərdə yayılması baxımından önəmli bir addım və universitetlər arasında ilklərdəndir. Bildirilib ki, təlim kursunda iki paralel sessiyada ümumilikdə 50 nəfərdən çox tələbə və müəllim iştirak edir. Tanınmış ekspert Elnur Eltürk bildirib ki, bu sahədə hazırda gənclərlə çox ciddi layihələrin icrasına başlanılıb və ADPU TKİB-in belə təşəbbüslə çıxış etməsi olduqca təqdirəlayiqdir. Bu sahədə son illər ərzində xeyli işlər görülməsinə baxmayaraq hələ də bu qlobal virtual ensiklopediyada kifayət qədər işlərin görülməli olduğunu bildirib. Vətən müharibəsi və Zəfərimizin təbliği baxımından qlobal informasiya məkanında əsaslı məlumatların yerləşdirilməsi ən önəmli məsələlərdəndir. Daha sonra Qorqud Vikipediya Metodiki Klubunun peşəkar təlimçisi iştirakçılarla ilkin söhbətlər aparıb, onların suallarını cavablandırılıb və praktik təlimlərə başlanılıb.



Şəhid Mübariz İbrahimovun atası



# Filiallarımızın fəaliyyəti

## ADPU-nun Cəlilabad filialında "2 Fevral - Azərbaycan Gəncləri Günü" münasibətilə onlayn tədbir keçirilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad filialında "2 Fevral – Azərbaycan Gəncləri Günü" münasibətilə Microsoft Teams platforması vasitəsilə onlayn tədbir keçirilib. Tədbirdə filial rəhbərliyi, professor-müəllim heyəti, təhsil müəssisəsində fəaliyyət göstərən tələbə ictimai təşkilatlarının təmsilçiləri və fəal tələbələr iştirak edib. Əvvəlcə şəhidlərin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Tədbiri giriş sözü ilə açan filialın direktor müavini Eyvaz Məmmədov tələbələri Gənclər Günü münasibətilə təbrik edib, onlara həyatda cansağlığı, uzun ömür, xoşbəxtlik, təhsildə və sosial fəaliyyətlərində böyük nailiyyətlər arzulayıb. E.Məmmədov bildirib ki, ölkəmizdə dövlət gənclər siyasətinin əsası müasir və müstəqil Azərbaycan dövlətinin qurucusu, xalqımızın Ümummilli lideri Heydər Əliyev tərəfindən qoyulub. Azərbaycan Respublikasının Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı cənab İlham Əliyevin bu siyasəti uğurla davam etdirməsi nəticəsində hazırda Azərbaycan gəncliyi ictimai həyatın bütün sahələrində fəal iştirak edir, cəmiyyətin aparıcı qüvvəsinə çevrilir. E.Məmmədov çıxışında vurğulayıb ki, filialın milli ruhda, dövlətə, dövlətçiliyə sədaqət ruhunda tərbiyə olunan məzunları Vətən müharibəsi dövründə həm ön cəbhədə, həm də arxa cəbhədə öz qəhrəmanlığı ilə seçiliblər. Onlar Azərbaycan xalqının tarixi qəhrəmanlıq salnaməsinin yazılmasında fəal iştirak ediblər. Tədbirdə filialın və respublikamızın ictimai-mədəni həyatında fəal iştirak edən 5 nəfər tələbəsi -Yusif Məmmədov, Murad Talıbov, Sevda Şahmarova, Aysel Haxverdiyeva və Bəsti Rəhimova Fəxri Fərmanla təltif edilib.

## ADPU-nun Quba filialının "Vətən müharibəsi"ndə iştirak edən tələbələri təltif edilib



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasının III tədris ili tələbəsi Ayaz Tahirov və "Tarix və coğrafiya müəllimliyi" ixtisasının II tədris ili tələbəsi Səfa Mərdanov 44 günlük "Vətən Müharibəsi"ndə iştirak edərək döyüş əməliyyatlarında igidlik nümayiş etdirdiklərinə görə və "2 Fevral - Azərbaycan Gəncləri Günü" münasibətilə filialın direktoru, dosent Yusif Alıyev tərəfindən Diplomlarla təltif olunublar. Könüllü olaraq döyüşlərə qatılan "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisasının III tədris ili tələbəsi Ayaz Tahirov öz fikirlərini bölüşərək bildirib ki, əslində bütün bu qəhrəmanlıqların, vətənpərvərliyin kökündə milli ruhda tərbiyə dayanır ki, bunun da təməlində təhsil aldığımız müəssisənin təlim, tədris və tərbiyəvi yönümdə gördüyü işlər durur. O həm də qeyd edib ki, ADPU-nun Quba filialını öz istəyi ilə seçib, ən böyük arzusu isə filiala 700 bal toplayaraq qəbul olmaq və ilkə imza atmaq olub.

## ADPU-nun Quba filialında şair-nasir, pedaqoq, qabaqcıl təhsil işçisi Rahib Sədullayevin 65 illik yubileyi qeyd edilib



Fevralın 23-də ADPU-nun Quba filialının akt zalında Ədəbiyyat və dillər kafedrasının baş müəllimi, qabaqcıl təhsil işçisi, şair-yazıçı Rahib Sədullayevin 65 illik yubileyinə həsr olunan tədbir keçirilib. Karantin qaydalarına tam şəkildə riayət olunmaqla baş tutan tədbirdə filialın direktoru dosent Yusif Alıyev, həmçinin şair, publisist, Azərbaycan Yazıçılar Birliyinin üzvü Ramiz Qusarçaylı, tanınmış şair və ədəbiyyatşünas, görkəmli ziyalımız Zakir Məmməd, və digər möhtərəm qonaqlar, filialın bir qrup əməkdaşı da iştirak ediblər. Qonaqlar və tələbələr şairin zəngin yaradıcılığının müxtəlif aspektlərindən söz açıblar. Rahib müəllim tədbir iştirakçılarına təşəkkürlərini bu cür ifadə edib:

"Nə yaxşı ki, varsınız,<br>
Sayənizdə mən varam.<br>
Bu sevgiyə, hörmətə<br>
Min kərə minnətdaram..."

## ADPU-nun Şamaxı filialında Xocalı Soyqırımı qurbanları və şəhidlər anılıb



Fevralın 26-sı Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında "Xocalı soyqırımı"nın ildönümünə həsr olunmuş anım tədbiri keçirilib. Tədbir filialın şəhid məzunlarının xatirəsinin əbədiləşdirildiyi guşənin önündə pandemiya qaydalarına əməl olunmaqla baş tutub. Tədbirdə filialın professor-müəllim heyəti və tələbələri iştirak ediblər. İlk olaraq "Xocalı Soyqırımı" qurbanlarının əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Tədbiri giriş sözü ilə açan filialın direktoru Tünzalə Yusifova 44 günlük "Vətən müharibəsi"ndə Xocalı qurbanlarının da qisasının alınmasından və torpaqlarımızın azad olunmasından danışıb. O, filialın məzunları Elgün Əzizov və Orxan Nəbiyevin məhz tarixi zəfər yürüşündə şəhid olduqlarını bildirib. Daha sonra Sosial və pedaqoji elmlər kafedrasının müdiri, Şamaxı rayon Ağsaqqallar Şurasının sədri, dosent Mayıl Alıcanov, Tədris və elmi işlər üzrə direktor müavini Şəsəddin Mikayılov və kitabxana müdiri Vəsilə Razımi Xocalı soyqırımının acı həqiqətlərindən və Vətən müharibəsində iştirak edən məzunlarımızdan söz açıblar. Qeyd edək ki, ADPU-nun Şamaxı filialının kitabxanasında Xocalı Soyqırımının tarixi faktlarını əks etdirən guşə də yaradılmışdır. Fevralın 24-də isə filialda "Xocalı Soyqırımı" mövzusunda elmi-praktiki konfrans təşkil olunub.

## "Dilimiz ruhumuzun mayasıdır" adlı elmi seminar



Fevralın 21-də universitetin Filologiya fakültəsinin təşkilatçılığı ilə "21 fevral – Beynəlxalq Ana Dili Günü"nə həsr edilmiş "Dilimiz ruhumuzun mayasıdır" adlı onlayn elmi seminar keçirilib. Tədbirdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərov, ADPU-nun Elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, Sosial və humanitar məsələlər üzrə prorektoru, professor Fikrət Rzayev, Tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Nəsimi adına Dilçilik İnstitutunun şöbə müdiri, professor İsmayıl Kazımov, Dövlət Dil Komissiyası yanında Monitorinq Mərkəzinin müdiri, professor Sevinc Əliyeva, Azərbaycan Texniki Universitetinin (AzTU) Humanitar fənlər kafedrasının müdiri, dosent Həbib Mirzəyev və Filologiya fakültəsinin professor-müəllim heyəti iştirak ediblər. Tədbiri giriş sözü ilə Filologiya fakültəsinin dekanı, professor Mahirə Hüseynova açaraq qonaqları, professor-müəllim heyətini salamlayıb və "21 Fevral – Beynəlxalq Ana Dili Günü"nün əhəmiyyətindən, ədəbi dil normalarının qorunması uğrunda mübarizədən danışıb. Seminarda prof. M.Nağıqızı "Dilimiz ruhumuzdur, onu qorumaq borcumuzdur", prof. B.Xəlilov "Azərbaycan dili: tarixilik və müasirlik müstəvisində", prof. İ.Kazımov "Müasir dil situasiyaları", dos. H.Mirzəyev "Dil mədəniyyətin güzgüsüdür", prof. M.İsmayılova "Qloballaşan dünyada Beynəlxalq Ana dili Gününün keçirilməsinin əhəmiyyəti", prof. S.Əliyeva "KİV-də Azərbaycan dilinin tətbiqi məsələləri", prof. M.Nuriyeva "Əsrlərin qovşağında ana dili-qayğılarımız", b/m S.Ağayeva "Ana dili hər bir xalqın kimliyidir" və İ.Əsgərov "Mətbuat dilində leksik norma pozuntuları" mövzularında məruzə və çıxışlar edib, müəyyən təkliflər səsləndirilmişlər.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

ADPU 100

## Təhsil gündəmi

### Azərbaycan ilə Türkiyə arasında peşə təhsili sahəsində əməkdaşlığa dair Protokol imzalanıb

Təhsil naziri Emin Əmrullayev Azərbaycan Respublikası ilə Türkiyə Respublikası arasında iqtisadi əməkdaşlıq üzrə Birgə Hökumətlərarası Komissiyanın 9-cu iclasında iştirak etmək məqsədilə Türkiyə Respublikasında səfərdə olub. Səfər çərçivəsində fevralın 19-da təhsil naziri Emin Əmrullayev və Türkiyə Respublikasının milli təhsil naziri Ziya Selçuk "Azərbaycan Respublikası Hökuməti ilə Türkiyə Respublikası Hökuməti arasında peşə təhsili sahəsində əməkdaşlığa dair Protokol"u imzalamışdır. Sözügedən Protokol iki ölkə arasında peşə təhsili sahəsində əməkdaşlığın genişləndirilməsini və müvafiq istiqamət üzrə Türkiyə təcrübəsinin öyrənilməsini özündə ehtiva edir.



### Təhsil, innovasiya və sağlam həyat tərzi üzrə işçi qruplar yaradılıb

"2021-2025-ci illərə dair sosial-iqtisadi inkişaf Strategiyası"nın hazırlanması məqsədilə təhsil, innovasiya və sağlam həyat tərzi üzrə alt işçi qruplar yaradılıb. Təhsil üzrə alt İşçi Qrupun rəhbəri Azərbaycan Respublikasının təhsil naziri, üzvləri isə maliyyə nazirinin müavini, iqtisadiyyat nazirinin müavini, əmək və əhalinin sosial müdafiəsi nazirinin müavini, gənclər və idman nazirinin müavini və mədəniyyət nazirinin müavinindən ibarətdir. Qeyd edək ki, Baş nazir Əli Əsədov "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"in təsdiq edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 2 fevral tarixli Sərəncamı ilə verilmiş tapşırıqların və uyğun olaraq qarşıda duran məsələlərin icrasının təmin edilməsi haqda sərəncam imzalayıb. "2021-2025-ci illərə dair sosial-iqtisadi inkişaf Strategiyası"nın hazırlanması məqsədilə yaradılmış Komissiyanın 5 prioritet istiqamət üzrə fəaliyyət göstərəcək 10 alt işçi qrupu yaradılıb və onlara müvafiq tapşırıqlar verilib.

### Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev fevralın 2-də "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"in təsdiq edilməsi haqqında sərəncam imzalayıb. "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" XXI əsrdə ölkəmizin inkişafı ilə bağlı qəbul olunan ikinci uzunmüddətli strategiyadır. Sənədə əsasən növbəti onillikdə ölkənin sosial-iqtisadi inkişafına dair aşağıdakı beş Milli Prioritet reallaşdırılmalıdır: *1.Dayanıqlı artan rəqabət qabiliyyətli iqtisadiyyat; 2. Dinamik, inklüziv və sosial ədalətə əsaslanan cəmiyyət; 3. Rəqabətli insan kapitalı və müasir innovasiyalar məkanı; 4. İşğaldan azad olunmuş ərazilərə böyük qayıdış; 5. Təmiz ətraf mühit və "yaşıl artım" ölkəsi.*

Bu milli prioritetlərin hər birinin alt sahələri müəyyənləşdirilir və onlara çatmaq üçün aydın yol xəritəsi təsvir edilir. Onlardan təhsilin gələcək mənzərəsini də etiva edən III Milli prioritetin alt sahələri aşağıdakılardır: *Bu prioritetin uğurla reallaşdırılması üçün aşağıdakı üç məqsədə nail olunmalıdır: - XXI əsrin tələblərinə uyğun təhsil; - yaradıcı və innovativ cəmiyyət; - vətəndaşların sağlam həyat tərzi.*

## ELAN

**ADPU Təhsil ixtisası üzrə magistraturada beynəlxalq ikili Diplom Proqramı elan edir**

"2019-2023-cü illər üçün Azərbaycan Respublikasında ali təhsil sisteminin beynəlxalq rəqabətliliyinin artırılması üzrə Dövlət Proqramı" çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) ilə ABŞ-ın nüfuzlu Corc Vaşinqton Universiteti (CVU) arasındakı sazişə əsasən növbəti tədris ili üçün magistraturada beynəlxalq ikili diplom proqramı elan olunur.

*Tədris ili: 2021/2022*
*Təhsil səviyyəsi: Magistratura*
*İxtisas: 1. CVU-nun verəcəyi ixtisasın adı: Təhsil və insan inkişafı: Təhsil siyasəti və liderlik;*
*2. ADPU-nun verəcəyi ixtisasın adı: Menecment (təhsilin təşkili və idarə olunması)*
*İlkin kvota: 25 nəfər*
*Tədris dili: ingilis dili*
*Müddət: 2 il*
*Təhsilalanların maliyyələşdirilən xərcləri:*
*-təhsil haqqı;*
*-qeydiyyat xərci;*
*-tədris materialları və elektron informasiya resurslarına çıxış xərcləri.*
*İlkin seçim meyarları:*
*- Tələbələrin seçimini Azərbaycan Respublikasının Dövlət İmtahan Mərkəzi (DİM) tərəfindən ali təhsil müəssisələrinə keçirilən qəbul imtahanlarının (magistratura) nəticələri əsasında tərəflər aparırlar;*
*- Müsabiqədə bakalavriat səviyyəsinin "Təhsil ixtisasları", "Humanitar və sosial ixtisaslar", "İqtisadiyyat və idarəetmə ixtisasları" və "Təbiət" ixtisasları qruplarında yer alan ixtisaslardan birini bitirən şəxslər iştirak edə bilərlər.*
*Son müraciət tarixi: 18.02.2021-ci il (DİM-in magistr imtahanın son qeydiyyat tarixi)*
*20.04.2021-ci il (İkili diplom proqramına sənədlərin son qəbul tarixi)*
*Müraciət şərtləri, proseduru və tələb olunan sənədlər, habelə əlavə məlumat almaq üçün aşağıdakı QR kodu telefonunuzda oxutmanız xahiş olunur.*




*Qeyd: Əziz oxucu! Əgər sizin telefonunuzda QR oxuma funksiyası yoxdursa, öncə "Play Market"dən QR kod oxuyucu proqram yükləyib sonra yuxarıdakı kodu oxudun.*



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №:443

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.